**"Şiəlikdə Mehdi inancının formalaşmasında fars mədəniyyətinin rolu."**

Bu çalışma pr. Fatih Topaloğlu'nun **"Şia'da Mehdi inancının oluşumunda fars kültürünün etkisi"** əsərindən edilmiş ixtisarlı tərcümədir. İstinad və istifadə olunan mənbələr aşağıda göstərilmişdir.

## İran mədəniyyətində "xilaskar" anlayışı

Xilaskar düşüncəsinin bəşəriyyətin zehninə nə zaman yerləşdiyini demək çox çətindir. Bu düşüncə çox güman ki, insanlığının yarandığı dövrdən bəri mövcud olmuşdur. Xilaskar düşüncəsini yalnız zərdüştiliklə əlaqələndirmək doğru olmazdı. Zərdüştilik də bu inancı formalaşdırarkən öncəki dinlərdən təsirlənmişdi. Beləki, Mesopotamiya coğrafiyasında bu inanclar min illər boyu hakim olmuşdur. Misal olaraq, ən qədim sivilizasiya olan şumerlər krallarını insan-tanrı qarışığı bir varlıq hesab edir, onları ideal, məsum, qüsursuz, ideal bir idarəedici və şumerlərin xilaskarı olaraq qəbul edirdilər.[1]

Xilaskar düşüncəsinin ən bariz örnəyinə fars mədəniyyətinin əsas ünsürlərindən sayılan zərdüştilikdə rast gəlinir. Zərdüştiliyin müqəddəs kitabı sayılan Avesta və Gatha kitablarında adı keçən "şaoşyant" kəlməsi xilaskar xarakteri olaraq ön plana çıxır.[2]

Bəzi tədqiqatçılara görə Sasanilər dövründə Avesta kitabında gəlməsi gözlənilən xilaskar obrazı "Bamdad Nask" bölümündə mövcud idi. Lakin, bugün Avesta kitabında bu fəsil mövcud deyil.[3]

Zərdüştlükdə olan "xilaskar" inancına görə Ahuramazda ilə Əhriman arasında savaş başlayandan sonra hər biri 3000 il davam edəcək dörd dövr yaşanacaq və 9000-12000 illəri arasında Ahuramazda bəşəriyyəti xilas etmək üçün Zərdüştü yer üzünə göndərəcək. Ondan sonra isə zaman keçdikcə dünyada əxlaq pozulacaq və şər artacaq. O zaman Ahuramazda Zərdüştün bir göldə olan toxumaları ilə orda çiməcək olan bakirə qızı hamilə edəcək və bu hamiləlikdən bir peyğəmbər dünyaya gələcək və o dünyanı qısa bir müddətdə islah edəcəkdir. Bu peyğəmbərdən min il sonra yenə möcüzəvi bir şəkildə ikinci, daha sonra min ildən sonra üçüncü, bu səfər sonuncu peyğəmbər dünyaya gələcəkdir. Bu sonuncu peyğəmbərin adı Saoşyant olacaqdır. Onun dövründə ölülər məzarlardan qalxacaq, dağlarda olan mədənlər əridiləcək və oradan çıxacaq süd möminlər üçün həyat, dinsizlər üçün isə əzab olacaqdır. Xüsusilə, bir çox pis insan və iblislər öləcək, yerdə qalan insanlar isə ölməzlik şərbəti içəcəklər.

[1] F.Topaloğlu, səh 111; Kramer, "Tarih Sumer’de Başlar" , səh 218-223
[2] F.Topaloğlu, səh 112; Ekrem Sarıkçıoğlu, "Günümüze Dinler Tarihi", səh 131-133

[3] F.Topaloğlu, səh 113, İbrahim Ali Rıza, "Mehdeviyyet der İslam ve Din-i Zertuşt", səh 23

Ondan sonra Ahuramazda ilə Əhriman arasında son döyüş olacaqdır. Nəticədə şəri təmsil edən Əhriman və bütün şər qüvvələr yox olacaq, dünyaya Ahuramazda hakim olacaqdır. Saoşyant vəya digər bir iddiaya görə Zərdüşt böyük bir ayin icra edəcək və dünyanı pisliklərdən təmizləyəcəkdir. Beləcə, dünyada əbədi xoşbəxtlik bərqərar olacaqdır.[4]

Saoşyant Avestada qeyd olunan əlamətləri, edəcəkləri və xüsusiyyətləri baxımından zərdüştiliyin təməl etiqadlarından sayılır. Saoşyant haqqında olan ayələr zərdüşt təfsirçiləri tərəfindən daha sonralar yorumlanmış və müxtəlif fərqli təsvirlərlə bu obraz süstlənmişdi. Deyilənə görə Saoşyant dünyaya gəlmədən öncə yer üzündə yalan və pislik hakim olacaq, küfr və əxlaqsızlıq yayılacaqmış. Xorasandan gələcək olan böyük küfr əhli kütlələr İrana hücum edəcək və hər yeri alt-üst edəcəklər. Zülm o qədər yayılacaq ki, ölüm arzu ediləcək, şəhərlər kəndə, kəndlər tək evlərə dönəcəkdir. Hakimiyyət iranlı olmayanlara və barbarlara (türk, rum, ərəb) keçəcəkdir. Bu dövrdə şan, şöhrət, əmniyyət iranlıların əlindən çıxacaq, yer yarılacaq, mücəvvər və mədənlər yer üzünə çıxacaq, insanlar böyük sərvətlər əldə edəcəklər.Hörmət, sədaqət, etibar ortadan qalxacaq, ata, oğul və qardaşlar arasında soyuqluq yaranacaq, müxtəlif din və məzhəblər zühur edəcəkdir. Saoşyantın gəlməsi ərəfəsində tibb elə inkişaf edəcəkdir ki, ölüm çətinləşəcəkdir.

Əhriman Firudin adlı mifik qəhrəmanın ağır mücadiləsindən sonra Demavənd dağına bağladığı və orada yatmaqda olan "Azi Dahaq" adlı "Dəbbətul Arz"ı oyadacaq və onu sərbəst buraxacaqdır. “Azi Dahaq” (Dəbbətul Arz) bütün gücü ilə dünyaya hücum edəcək, saysız cinayətlər törədib, insanların üçdə birini udacaq, suları, bitkiləri və təbiəti tələf edəcəkdir.

Bundan sonra insanlar Azi Dahaqı öldürmək üçün Firudi'nin təkrar həyata qaytarılması üçün Ahuramazdaya dua edəcəklər. Nəhayət, Ahuramazdanın əmri ilə Firudin ölüm yuxusundan oyanacaq və Saoşyant gəlmədən öncə Dabbətul-Arz olan Azi Dahaqı öldürəcəkdir. Daha sonra Zərdüştün hamun vəya kasava gölündə olan "fravaşi" adlı mənəvi toxumu səbəbi ilə “Govak-pit” adlı bakirə qızın gölə girməsi nəticəsində o Saoşyanta hamilə qalacaqdır. Dünyaya gələn Saoşyantın vücudu günəş kimi nur saçacaq, dörd tərəfini altı gözlə görəcəkdir. O zərdüştiliyin müqəddəs kitabı olan Avestanı özünə rəhbər biləcək, dinin hökmlərini əsas alaraq, yalan və pislikərə qarşı mübarizə aparacaqdır. Müqəddəs kitabda həllini tapmadığı məsələlərdə isə o tanrı Ahuramazdadan vəhy alacaqdır. O dünyanı öz hökmü altına alacaq, ölkəsini ilahi qanunlara görə idarə edəcək, insanların təbiətini dəyişdirəcək, xəstəlik, qocalıq və ölümü aradan qaldıracaqdır.

Rahiblərin ən üstünü olaraq, insanlara Ahuramazda dinini öyrədəcəkdir. Zamanın axırına 57 il qalmış, şeytani varlıqları məhv edəcək və hakimiyyəti Ahuramazdaya verəcəkdir. Sonra həşr və hesab günü gələcəkdir.[5]

---

[4] F.Topaloğlu, səh 114; Hacaloğlu, "Zerdüşt ‘Ahuramazda", səh 65-66; Sarıkçıoğlu, "Dinler Tarihi", səh 131

[5] F.Topaloğlu, səh 116; Sarıkçıoğlu, “Mecusi Dininde Mehdi İnancı”, səh 205-228

### Şiəlikdə Mehdi inancının ortaya çıxması

Mehdi inancı İslamdan öncəki yəhudilik, xristianlıq, zərdüştilik kimi yaxın Şərq və Mesopotamiya bölgəsində olan dinlərdə hətta, uzaq Şərq və gəlmiş-keçmiş bütün dinlərdə olması bilinən bir fenomendir.[6]

Şiəliyin fars mədəniyyətindən təsirləndiyi mövzusunda elm adamları müxtəlif rəydə olduğu kimi Mehdi inancının qaynağı haqqında da müxtəlif rəylər mövcuddur. Philip Hitti və Margolius kimi şərqşünaslar İslamda Mehdi inancının yəhudi və xristianlıq dinlərində və o xalqların mədəniyyətlərində mövcud olmuş Məsih inancından böyük ölçüdə təsirləndiyini iddia etmişlər.Saffet Sarıkaya və bir çox müəlliflər də Əməvi və Abbasilər dövründə ortaya çıxmış Mehdi inancının əhli kitabın təsiriylə şiə firqələrinə keçdiyini iddia etmişlər.[7]

Şiəliyin bəzi əsaslarının yəhudilikdən aldığı fikrini ilk dəfə çox güman ki, imam ibn Həzm (öl.441) və Şa'bi qeyd etmişlər. Şa'bi dedi: "Bu şiələr yəhudilərin yolu ilə getdilər. Çünki, yəhudilər İlyas (ə) və Fənhas ibn Azar ibn Harun'un (ə) indiyə qədər diri olduğunu iddia etmişdilər. Bəzi sufilər də onlar kimi Xızır (ə) və İlyasın (ə) indiyə kimi sağ olduğunu iddia etdilər." Şiəliyin bəzi iddiaları yəhudiliyə uyğun gəlsə də əsas fikirlər və inancları əsas etibarilə İran mənşəlidir.[8]

Digər tərəfdən, Tövratın ilk nüsxələrində "xilaskar" inancının olmadığı, bunun ilk dəfə yəhudilərin Babildə sürgündə olarkən, zərdüştlik kimi dualist dinlərlə tanışlıqdan sonra ortaya çıxdığı qeyd olunur. Beləki, yəhudilər Babil sürgünündə olanda əsarətin verdiyi acı və İran dinlərinin təsiri ilə məsih (xilaskar) inancını mənimsəmişdilər.[9]

Şiəlikdə Mehdi anlayışının necə, hansı şəraitdə ortaya çıxdığını izah etməmişdən öncə şiəliyin meydana gəldiyi dövrdə siyasi, ictimai, sosial, psixoloji və tarixi hadisələri təhlil etmək lazımdır.Hz.Əli zamanında xilafətin mübahisəli şəkildə Müaviyəyə keçməsi, Əlinin şəhid edilməsi, Həsənin xilafətdən vaz keçməsi, Əli tərəfdarlarında (şiələr) ümidsizlik və narahatçılıq yaradan başlıca amillər idi. Belə şəraitdə Əli tərəfdarlarının zehnində bir "xilaskar gözləmə" düşüncəsi üçün zəmin artıq yetişmişdi.

---

[6] F.Topaloğlu, səh 118; Sarıkçıoğlu, "Dinlerde Mehdi Tasavvurları", səh 13-18; Fığlalı, Ethem Ruhi, "Mesih ve Mehdi İnancı Üzerine", səh 179

[7] F.Topaloğlu, səh 118; Saffet Sarıkaya, "İslam'da Mehdi İnancına Dair", İslam Dergisi, CLV, 2528

[8] F.Topaloğlu, səh 119; İbn Hazm, "el-Fasl fi'l-Milel ve'l-Ehva ve'n-Nihal", II, səh 115; Ebu Zehra," İslam'da İtikadi, Siyasi ve Fıkhi Mezhepler Tarihi", səh 44-45

[9] F.Topaloğlu, səh 119; Hacaloğlu, "Zerdüşt 'Ahuramazda", səh 65, 78

Şiəliyin öndə gələnləri imamətin Əli övladlarının haqqı olduğu fikrini, xilaskar bir Mehdinin bir gün gəlib Əməvilər vəya sonrakı dövrlərdə Abbasilərdən iqtidarı alacağı fikrini sıravi şiələrə aşılamaq üçün bu inancı sui istifadə etmişdilər. Əməvi və Abbasi xəlifələrinin şiələr üzərində tətbiq etdiyi təzyiqlər də bu düşüncənin möhkəmlənməsində rol oynamışdı. Beləki, zülm, təzyiq və müxtəlif işgəncələrə məruz qalan və bunlara qarşı müqavimət göstərə bilməyən sadə xalq kütlələrində onları bu vəziyyətdən xilas edəcək xarizmatik bir rəhbər gələcəyi düşüncəsi yaranmaqda idi. İlk dövrlərdə Mehdi sadalanan səbəblərə görə şiələrin siyasi lideri vəsfini daşıdığı halda sonralar onun mükəmməl, qeyri bəşəri vəsflərə sahib xilaskar məsum imam olduğu haqqında rəvayyətlər icad olunmağa başladı.[10]

Həmçinin, Mehdi inancının ortaya çıxması və yayılmasında şiəlikdə son imamın "qeybət" inancı da təsirli olmuşdur. Mehdilik məsələsini daha yaxşı anlamaq üçün "qeybət" inancına da toxunmaq lazımdır.

Qeybət lüğəti mənada qeyb olma, gizlənmə, yalnızlıq, uzaq qalma mənalarını verir. Şiələrin nəzərində bu imamların ölməyib, gözdən itdiyi və Qiyamət günündən öncə yerə qayıdacağı mənasını verməkdədir. Qeybətdə olan imam da "qaib imam" sifəti ilə vəsfləndirilir. Bütün şiə firqələrində mövcud olan "qeybət" inancı şiəliyin imami qolunda digərlərinə nisbətən daha da ön plana çıxır. Bu inancı sistematik hala gətirən və məzhəbin ayırd edici təməl əsası halına gətirən yenə imamiyyə firqəsi olmuşdur.[11]

Şəhristaniyə görə "qeybət" fikirini ilk dəfə ortaya atanlar muxtariyyə mənsublarından olan Kuseyyir Azzə (105/723) və Seyyid əl Himyəri (173/789) adlı şairlər olmuşlar. Bunlar Muxtar əs Səqəfinin başçılıq etdiyi keysaniyyə firqəsindən idilər. Bu firqə Əlinin Fatimədən deyil, digər qadından olan oğlu Muhəmməd əl Hənəfiyyənin imamətinə (81/700), onun ölmədiyinə, əksinə qeyb olduğuna, bir müddət qeybdə qaldıqdan sonra zülmlə dolu olan dünyaya qayıdıb, ədalət gətirəcəyinə inanırdılar.[12]

Xətib Bağdadi Muhəmməd əl Hənəfiyyənin ölməyib, geri dönəcəyinə inananların Muxtariyyə'nin alt qolu olan kərbiyyədən olduğunu qeyd edirdi.[13]

Belə aydın olur ki, imamiyyə şiəsindəki on ikinci imamın qeybəti və rəcat düşüncəsi daha öncələri bəzi kimsələrin zehnində hakim idi. Beləki, keçmişdə İran, Roma ve Hind kralları öz taxtlarına görə bəzi qohumlarından qorxduqları üçün onların gizləndikləri rəvayyət edilib.[14]

---

[10] F.Topaloğlu, səh 121; Alusi, "Ruhu'l-Meani fi Tefsiri'l-Kur'ani'l-Azim ve's-Seb'i'l-Mesani", XX, 26; Ahmed Emin, "Duha'l-İslam", III, 241

[11] F.Topaloğlu, səh 121; Fığlalı, "Gaib",XIII, 292; Bulut, Halil İbrahim, "İlk Dönem İmami Kaynaklarda Gaybet Anlayışı",VIII/2, 51, 52

[12] F.Topaloğlu, səh 122; Şehristani, "Milel ve Nihal", səh 137-138

[13] F.Topaloğlu, Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 31

[14] F.Topaloğlu, səh 123; Hakyemez, "Şia'da Gaybet İnancı ve Gaib Onikinci İmam", səh 96

İmamiyyəyə görə on birinci imam Həsən əl Əsqərinin oğlu Muhəmməd Samarrada bir cariyədən 255/869-ci ildə doğulmuşdu. Həsən əl Əsqərinin 260/874 ci ildə vəfatından sonra beş yaşında ikən mağarada vəya zirzəmidə qeyb olmuş və imamiyyənin inancına görə Muhamməd, Qaim vəya Mehdi olaraq dönənə qədər qeybdə qalacaqdır. İddiaya görə hicri 260-329 tarixləri arasındakı dövrə "qeybəti suğra" (kiçik qeyb dövrü, 53 il) adı verilmiş və Muhəmməd bu dövrdə öz tərəfdarları ilə əlaqəsini ard-arda seçilmiş dört naibi vasitəsilə həyata keçirmişdi. Kiçik qeyb dövründə qaib imamın səfiri vəzifəsini Osman ibn Səid, Muhəmməd ibn Osman, Hüseyin ibn Ruh, Əli ibn Muhəmməd yerinə yetirmişdi. Bu dövrdə özünü naib elan edən bir çox yalançı da zühur etmişdi. Dördüncü naib ölmədən əvvəl on ikinci imamdan möhürlü fərman aldığını bildirərək, bundan sonra naib gəlməyəcəyini bildirmişdi. Son naibin 329/941 ci ildə ölümündən sonra Mehdinin tamamilə qeybə çəkildiyi iddia olunmuş və onun gələcəkdə zühur edəcəyi dövr də "böyük qeybət" dövrü adlandırılmışdır.[15]

Digər tərəfdən imami şiə etiqadına görə Mehdi zühur etdikdən sonra digər on bir imam və seçilmiş insanlar rəcət (dirildilərək) etdirilərək yer üzünə gələcək və imama hökmranlıqda yardım edəcəklər. Şiələrin qeyri bəşəri vəsflərlə təsvir etdikləri Mehdinin yanına yardımçı olaraq on bir imam da əlavə etmələri çox qəribədir. Rəcat zamanı Mehdiyə yardım edəcək bu imamlar Zərdüştə yardım edən "izedlərə" bənzəyir. Bu da şiə qeybət inancının qədim İran dinlərində olmuş personaj və ünsürlərdən təsirləndiyi fikrini ağla gətirir.[16]

Növbəxti (310/922) "Kitabu firəq əş şia", Qummi (301/913) "Kitabul məqalət vəl firaq" kitablarında on birinci imam Həsən əl Əsqərinin ölümündən sonra şiələrin firqələrə və alt qruplara ayrılmağından bəhs etməkdədir. Həmin bu şiə alimləri qeyd edirlər ki, Həsən əl Əsqərinin vəfatından sonra yaranmış firqələrdən biri olan imamiyyə firqəsi iddia edirdi ki, imam ölməmişdən öncə yerinə kiçik oğlunu varis təyin etmiş, o qeybə çəkilmiş və axır zamanda zühur edəcəkdir.[17]

Mehdinin kimliyi, xüsusiyyətləri, nə vaxt və haraya gələcəyi baradə şiə firqələri arasında fikir ayrılığı olsa da onların hamısı Mehdinin gəlişinə inanırlar. Şiə firqələri Mehdi olduğuna inandıqları imamların ölmədiyi, qeybə çəkildiyi vəya əslində ölmədiyini, bir gün geri qayıdaraq düşmənlərindən intiqam alacağı, yer üzündə ilahi hakimiyyət quracağı məsələsində həmfikirdirlər. Tarixdə baş vermiş şiə üsyan hərəkatlarına baxdıqda görürük ki, onların imamları öldürüldüyündə o qruplar ya özlərinə yeni bir imam seçmiş ya da imamlarının ölməyib, qeybə çəkildiyinə, bir gün geri dönəcəyinə iman etmişlərdi.[18]

---

[15] F.Topaloğlu, səh 124; Fığlalı, "İmamiyye Şiası, səh 174

[16] F.Topaloğlu, səh 123; Hakyemez, "Şia'da Gaybet İnancı ve Gaib Onikinci İmam", səh 42-43

[17] F.Topaloğlu, səh 125; Kummi, "el-Makalat ve'l-Fırak", səh 102-103; Nevbahti, "Fıraku'ş-Şia", səh 90-93; Kohlberg, "İmamiyye'den İsnaaşeriyye'ye", çev. Cemil Hakyemez, Dinbilimleri Akademik Araştırma Dergisi, Cilt: V, Sayı: 3, 2005, s. 287-288

[18] F.Topaloğlu, səh 126; Kutluay Yaşar, "İslam ve Yahudi Mezhepleri", səh 291-292

**Şiə firqələrinin Mehdi anlayışı və fars mədəniyyətinin bunda təsiri**

Şiəliyin zaman içərsində xüsusilə imamət barada fikir ayrılıqları nəticəsində çox sayda firqələrə və qruplara bölündüyü məlumdur. İmamətlə bərabər mehdilik məsələsində də şiə firqələri bir çox qollara bölünmüşdülər. Şiəlikdə ortaya çıxan dini-siyasi fikir hərəkatı olaraq qəbul edilən ilk firqə hz Hüseyn və yoldaşlarının intiqamını almaq üçün üsyan qaldıran Muxtar əs Səqəfinin (67/687) adı ilə muxtariyyə vəya hz Əlinin xidmətçisi Keysana nisbət edilərək, Keysaniyyə adlı firqə olmuşdur.

Sonralar imamət və mehdiliklə bağlı bəzi fikir ayrılıqlarına görə kərbiyyə, bəyaniyyə, hərbiyyə kimi qollara ayrılan keysaniyyə firqəsi əsasən hz Əlinin Fatimədən (ə) deyil, digər qadından olan oğlu Muhəmməd Hənəfiyyənin (80/700) imamətinə, ölümündən sonra isə Mehdi olduğuna inanırdılar. Onlara görə Muhəmməd Hənəfiyyə ölməmiş, Radva dağına çəkilmişdi. Yanında su və bal bulaqları vardır. Gözlənilən Mehdi olaraq, ortaya çıxana qədər onu düşmənlərindən yanında olan aslan və qaplan qoruyacaqdır.[19]

Keysaniyyə'nin haşimiyyə firqəsinə aid fikirlərinin şiəlik tarixi baxımından önəmli olduğuna diqqət çəkən avropalı şərqşünas Vloten bu firqənin batini təfsir anlayışının İslamdan öncə mövcud olmuş məcusilik, manihizm, budizm kimi dinlərdən alınma fikirlər üzərində qurulduğunu qeyd etmişdir.[20]

Mehdilik barada qeyd olunması zəruri olan firqələrdən də biri Abdullah ibn Səba'nın adı ilə bağlı olan səbəiyyə firqəsidir. Deyilənə görə səbəiyyə Əli öldürülən zaman öldürülənin Əli olmadığına, onun ancaq insanlara Əli şəklində görünən şeytan olduğuna inanmış, onun hz İsa kimi göyə çıxdığını iddia etmişdi. Bu firqənin bir qismi isə Əlinin deyil, ona bənzəyən birinin öldürüldüyünü və imamın səmaya ucalığını iddia etmişdilər. Onun zamanı gəldiyində qayıdıb, düşmənlərindən intiqam alacağına inanırdılar. [21]

Şiə firqələrindən olan zeydiyyə isə Zeynəlabidinin oğlu Zeydə nisbət edilir. Bu firqə imam Zeyd (122/740) tərəfindən Əməvilərə qarşı baş vermiş üsyanda öldürüldükdən sonra oğlu Yəhya və ardıcılları tərifindən qurulmuşdu. Onların özlərinə məxsus imamət nəzəriyyəsi vardı.Zeydilər ilk iki xəlifənin imamətini tanıyırdılar və fəzilətilə bilinən istənilən şəxsin imamətini tanıyırdılar. Zeydilər müəyyən tarixi dövrlərdə Təbəristan və Yəməndə siyasi hakimiyyət qurmuşdular.[22]

---

[19] F.Topaloğlu, səh 128; Nevbahti, "Fıraku'ş-Şia", səh 27; Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 3132; Şehristani, "Milel ve Nihal", səh 136

[20] F.Topaloğlu, səh 128; Vloten,"Emevi Devrinde Arap Hakimiyeti Şîa ve Mesih Akideleri Üzerine Araştırmalar, səh 54

[21] F.Topaloğlu, səh 129; Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 177

[22] F.Topaloğlu, səh 129; Şehristânî, "Milel ve Nihal", səh 142; Fığlalı, Çağımızda İtikadi İslam Mezhepleri, səh 123-129

Zeydiyyə digər şiə firqələri kimi qeybdə olan, gəlişi gözlənilən bir mehdi anlayışını qəbul etmir əksinə, imanın insanlar arasında yaşayan, onların dünya işlərini idarə edən və hökmləri icra edən bir insan kimi qəbul edirdilər.[23]

Zeydiyyə firqələrindən olan carudiyyə xəlifə Mənsur zamanında Mədinədə öldürülən Əbu Abdullah Muhəmməd ibn Abdullah ibn Həsən ibn Həsən ibn Əli ibn Əbu Talibin - Nəfsuz-zəkiyyə'nin (145/762) Mehdiliyinə inanırdılar. Onlara görə o ölməmiş və öldürülməmişdir, yaşayır və bir gün geri qayıdacaqdır. Bunlar da öz aralarında müxtəlif qollara ayrılmışdılar. Bir qismi imam Həsən vəya Hüseyn soyundan gələn istənilən qılıncını çəkib, özünə dəvət edəni imam hesab etmişdilər. Digər bir qismi isə Kufədə öldürülən Əbul Hüseyn Yəhya ibn Ömər Yəhya ibn Hüseyn ibn Əli ibn Əbu Talibin (250/864) Mehdi olduğuna inanır və ölümünü qəbul etmirdilər.[24]

Bir qismi də Tələqanın əmiri olaraq bilinən Muhəmməd ibn Qasım əl Ələvinin (219/834) ölmədiyinə və gözlənilən Mehdi olub, yer üzünə dönüb ədalətlə hökm edəcəyinə inanırdılar.[25]

Mehdilik qulat cərəyanlarından birinin başında dayandığı Muğira ibn Səid'in rəhbərlik etdiyi muğiriyyə firqəsində də görülməkdədir. Muğira imam Muhəmməd əl Baqirin gözlənilən Mehdi olduğuna etiqad edirdi. Digər tərəfdən onun Əbu Abdullah ibn Muhəmmədə (Nəfsuz-zəkiyyə) də meyl etdiyinə dair rəvayyətlər vardır. Çox güman ki, o ilk öncə Baqiri imam və Mehdi olaraq qəbul etmiş, daha sonra onun ölümündən vəya beyətini pozduqdan sonra Nəfsuz-zəkiyyəyə iqtida etmişdi. Muğiranın ölümündən sonra isə hərəkatın başına rəcata etiqad edən Cabir əl Cufi keçmişdi.[26]

Muğriyyə Nəfsuz-zəkiyyə'nin ölümündən sonra müxtəlif qollara ayrılmışdı. Bir qismi onun yerinə əslində bir şeytanın öldürüldüyünü iddia etmişdi. Bunlar Nəfsuz-zəkiyyə' nin Hacir dağında gizləndiyini və bir gün Məsih timsalında zühur edəcəyini iddia etmişdilər. Ehtimal olunur ki, bu inanc Muhəmməd Hənəfiyyənin Radva dağında gizləndiyini iddia edən Kərbiyyədən götürülmüşdü.[27]

Muğriyyə mənsubları imam Baqirin imamlığı Muğira ibn Səidə vəsiyyət etdiyinə və Mehdi ortaya çıxana qədər imamlığın onda olacağına inanırdılar. Muğriyyə firqəsinin təsəvvürlərində Zərdüşt və Maniheizm dinlərindən qalma düşüncələr hakim idi. Bu firqənin fikirlərində qnostik və maniheizm anlayışları yer alırdı. Bir çox inancları səbəbi ilə qulat şiə firqələri ən çox İran dinlərinə məxsus fikirləri mənimsəyən firqə hesab olunmaqdadır. Onlar bu fikirləri keçmiş məcusi dinləri və məzdəki tipli keçmiş İran mənşəli siyasi, etiqadi cərəyanlardan əxz etmişdilər.[28]

---

[23] - F.Topaloğlu, səh 130; Doğan, "Zeydiyye Mezhebinin Doğuşu ve Kelami Görüşleri", səh 150

[24] F.Topaloğlu, səh 130; Kummi, "el-Makalat ve'l-Fırak", səh 18; Nevbahti, "Fıraku'ş-Şia", səh 48-49

[25] F.Topaloğlu, səh 130; Mesudi, "Mürucu'z-Zeheb" c. 4,səh 52-53; Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 26-27

[26] F.Topaloğlu, səh 131; "Kummi, el-Makalat ve'l-Fırak", səh 75; Nevbahti, "Fıraku'ş-Şia", səh 52, 54

[27] F.Topaloğlu, səh 131; Nevbahti, "Fıraku'ş-Şia", səh 26

[28] F.Topaloğlu, səh 132; İbn Hazm, "el-Fasl", II, 115; Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 266

Şiəliyin, xüsusilə qulat fikir və inanclarının məcusi farslardan alındığını keçmiş şiə alimləri də etiraf etmişlər. İmami şiə alimlərindən olan Növbəxti (öl.H.310/922) və Qummi (öl.H.301/913) qulat şiələrin məcusi, məzdəki, xürrəmi, dəhriyyə kimi keçmiş İran mənşəli cərəyanların mənsubları olduqlarını qeyd edirdi.[29]

İsmailiyyə şiələri də başda Cəfər əs Sadiq (148/765) olmaqla bəzi imamların mehdiliyinə inanırdılar. Halbuki, Cəfər əs Sadiq də atası Muhəmməd Baqir (114/733) və babası Zeynəlabidin kimi həyatını ancaq ibadətə və elmə həsr etmişdi. Cəfər əs Sadiqdən sonra oğlu İsmayılın imamətinə inandıqlarına görə bu adı alan ismailiyyə firqəsi etiqad edirdi ki, atası Cəfər əs Sadiqin oğlu İsmayıl ölməmiş, gizlənib, qeybə çəkilmiş və Mehdi olaraq geri qayıdıb dünyada ədalətlə hökm sürəcəkdir. Onlar bu iddialarında Cəfər əs Sadiqin sözlərinə əsaslandıqlarını deyirdilər.[30]

İsmailiyyə firqəsi də böyük ölçüdə zərdüştilik, maniheizm və məzdəki inanclarından təsirlənmişdir. Onlar xüsusilə İran coğrafiyasında "dai", təbliğatçıları tərəfindən aparılan propaqanda nəticəsində özlərinə böyük dəstək əldə edə etmiş və köhnə dinləri zərdüştilik olan insanları öz sıralarına daxil edə bilmişdilər. İsmailiyyə mənsublarının əsərlərində Allahın nəfsi yaratdığını və hər ikisinin də bu aləmi idarə etdiyini yazdığını deyən Bağdadi bu inancın zərdüştilikdə olan Ahuramazda və Əhriman ikiliyindən əxz olunduğunu qeyd etmişdir.[31]

Mehdi inancına imami şiə firqələri sırasında qeyd olunan navusiyyə, şumeytiyyə, musəviyyə kimi firqələrə də də rast gəlinir. Navusiyyə Bəsrədə Navus adlı bir şəxsə tabe olan firqədir. Mənbələrdə qeyd olunur ki, Cəfər əs Sadiqin vəfatından sonra şiələr altı firqəyə bölündülər və onlardan navusiyyə iddia edirdi ki, imam Cəfər ölməmişdir və o mehdi olaraq insanlara imamlıq etmədən də ölməyəcəkdir. Hətta, iddialarını dəstəkləmək üçün imam Cəfərin bu barədə guya dediyi sözlərə də əsaslanmışlar.[32]

Navusiyyə firqəsinin bir qismi imam Cəfərin əqli və şəri bütün elmləri bildiyini iddia edirdilər. Yəhya ibn Şumeytin rəhbəri olduğu şumeytiyyə navusiyyədən fərqli olaraq imam Cəfərin öldüyünü qəbul etmiş və Mehdinin imamın oğlu Muhəmməd ibn Cəfər olduğunu iddia etmişdi. Daha sonra isə Mehdinin Muhəmməd ibn Cəfərin oğullarından biri olacağını iddia etmişdilər.Musaviyyə firqəsi də imam Cəfərin oğlu Musa əl Kazımın imamətinə inanmış, onun ölmədiyinə, xəlifə Harun ər Rəşidin evinə girib, oradan qeyb olduğuna və onun Mehdi olduğuna etiqad edirdilər. Onlar

---

[29] F.Topaloğlu, səh 133; Kummi, "Makalat ve'l-Fırak", səh 61, 62, 64; Nevbahti, "Fıraku'ş-Şia", səh 41-42

[30] F.Topaloğlu, səh 133; Nevbahti, "Fıraku'ş-Şia, səh 57-58; Üzüm, "Tarihten Günümüze Şia'nın Mehdi İnancı", Yeni Ümit Dergisi, LXXV, 58

[31] F.Topaloğlu, səh 134; Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 222-223

[32] F.Topaloğlu, səh 135; Nevbahti, "Fıraku'ş-Şia", səh 57; Şehristani, "Milel ve Nihal", səh 151

deyirdilər ki, biz onun imamətini gözləyir və ölümünə şübhə edirik. Ona görə də onun ölümünü qəbul etmirik.[33]

İmami şiələr Cəfər əs Sadiqdən (148/765) sonra yeddinci imam olaraq Musa əl Kazımı, ondan sonra oğlu Əli ər Rzanı, (203/819) sonra atadan oğula keçid qaydası ilə Muhəmməd ət Təqi, (220/835) sonra Əli ən Nəqi, (254/868) sonra Həsən əl Əsqəri (260/874) və Muhəmməd ibn Həsənin imamətinə etiqad edirdilər.Sonuncu şəxs eyni zamanda qaib imam və Mehdi olaraq qəbul edilmiş və beləliklə on iki imam şiəliyi ortaya çıxmışdır.[34]

İmamiyyə firqəsində Musa əl Kazımdan sonra şiələr arasında davamlı olaraq ixtilaflar meydana çıxmış, hər imam öldükdən sonra müəyyən qruplar öz imamlarının ölmədiyini, qeybə çəkildiklərini və Mehdi olaraq zühur edəcəklərini iddia etmişdilər.

Misal olaraq, on birinci imam Həsən əl Əsqərinin vəfatından sonra onun tərəfdarları müxtəlif qollara ayrılmışdı. Bunlardan bəziləri Həsən əl Əsqərinin ölmədiyini və onun Mehdi olduğunu iddia etdilər. Bəziləri də imamətin qardaşı Cəfərə keçdiyini, bir qismi də cariyəsindən olan oğlu Muhəmmədin Mehdi olduğunu bəyan etmişdilər.[35]

Buveyhilər sülaləsinin bölgədə hakimiyyətə gəlməsindən sonra imamiyyə firqəsi imamət, mehdilik başda olmaqla dini və siyasi görüşləri daha da aktiv təkmilləşdirməyə çalışmış, bu mövzularda rəvayyətlər, kitablar tərtib etmişdi.

Bu dövrdə mehdiliklə bağlı bir-biri ilə ziddiyyət təşkil edən rəvayyətlər və fikirlər qarşılaşdırılıb, daha münasib bir mehdi obrazı yaradılmağa cəhd göstərilmişdi. Mehdinin gizlənmə səbəbi, zühurunun əlamətləri, zamanı, yeri və s.mövzularda rəvayyətlər və açıqlamalar bu dövrdə yazılmağa başlanmışdı. Mehdinin gizlənmə səbəbi ilə bağlı ilk dövrlərdə "dostların azlığı", "düşmənlərin çoxluğu" kimi səbəblər göstərilsə də, sonralar şərtlərin dəyişməsi ilə bunun "İlahi bir sirr" olduğu və möminlər üçün bir imtahan vəsiləsi olduğu kimi izahlar gətirilməyə başlanmışdı.[36]

---

[33] F.Topaloğlu, səh 136; Eş'ari, "Makalatu'l-İslamiyyin", səh 56; Bağdadi, "Mezhepler Arasındaki Farklar", səh 46, 47; Şehristani, "Milel ve Nihal", səh 151, 153

[34] F.Topaloğlu, səh 136; Fığlalı, "İmamiyye Şiası", səh 163-173; Üzüm, "Tarihten Günümüze Şia'nın Mehdi İnancı", səh 59

[35] F.Topaloğlu, səh 137; Nevbahti, Fıraku'ş-Şia, səh 96

[36] F.Topaloğlu, səh 138; Saduk, "Kemalu'd-Din", səh 479-482; Meclisi, "Bihâru'l-Envâr", LII, 90-100

## Yekun:

Şiəlikdə Mehdi inancının formalaşmasında İran mədəniyyətinin boyük təsiri olmuşdur. Çünki, müsəlmanlar artan fəthlər nəticəsində xilafətə daxil olan müxtəlif xalqlar və icmalar səbəbi ilə çoxlu dini, siyasi problemlərlə üz-üzə qalmışdılar. Hz. Muhəmməddən (sallallahu aleyhi və səlləm) sonra daha heç bir peyğəmbərin gəlməyəcəyi həqiqəti müsəlmanları peyğəmbər qədər xarizmatik lider axtarışına sövq etmişdi. İnsanlar, sadə xalq kütlələri zaman-zaman bu boşluğu Mehdi olaraq adlandırdıqları şəxslərlə doldurmağa çalışırdılar. İslam öncəsi İran coğrafiyasında mövcud olmuş keçmiş fars dinlərinə dair inanclar da bu düşüncənin ortaya çıxmasına təkan vermişdi. İran coğrafiyasında yüz illərlə hakim olmuş zərdüştilik dinindəki "xilaskar" obrazı mehdilik inancının fərqli bir formada təzahür etməsinə zəmin hazırlamışdı. Zərdüştilik dininin əsas inanclarından biri o idi ki, zamanın sonunda bir xilaskar gələcək və o əmrindəki xeyir qüvvələrlə şər qüvvələrə qalib gələcəkdir. Zərdüştlükdə xilaskar obrazını təmsil edən Şaoşyant şiəlikdə Mehdi obrazının təşəkkül tapmasında xüsusi rol oynamışdı.[37]

[37] F.Topaloğlu, səh, 141